AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, № 3 (269), 105-113
https://dx.doi.org/10.48445/f0863-4369-9462-o

**X A L Q   Y A R A D I C I L I Ğ I**

# Oyunların elmi təhlili və onların uşaqların əqli-fiziki inkişafında əhəmiyyəti

***Çinarə Rzayeva***
Filologiya üzrə fəlsəfə doktoru, AMEA Naxçıvan Bölməsi. Azərbaycan.
E-mail: cinarerzayeva@yahoo.com.tr
https://orcid.org/0000-0003-0655-9342

**XÜLASƏ**
Uşaq folklorunun əsas hissəsini oyunlar təşkil edir. Sevindirici haldır ki, hər yaş dövrünə uyğun uşaq oyunları vardır. Uşaq oyunları sağlamlıq və zehnin inkişafı üçün xüsusilə əhəmiyyətlidir. Bu oyunların bir qismi zehni inkişaf etdirən, bir qismi isə sağlamlığı möhkəmləndirən, yəni idman xarakterlidir. Məqalədə bir sıra uşaq oyunları tədqiqata cəlb edilmiş, onların uşaqların sağlamlığı naminə nə dərəcədə böyük əhəmiyyətə malik olması nümunələrlə izah olunmuşdur.
Qeyd edək ki, uşaq oyunlarının tərbiyəvi əhəmiyyəti, sağlamlıq, diqqət artırmaq, müxtəlif növ bacarıqları inkişaf etdirmək, ən əsası isə pis vərdişlərdən uzaq olmaq üçün rolu danılmaz, əhəmiyyəti isə böyükdür.

**AÇAR SÖZLƏR**
uşaq, folklor, oyun, diqqət, inkişaf

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 09.08.2021
qəbul edilib: 16.08.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent Bilal Həsənli.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 3, VOL. 269, 105-113
https://dx.doi.org/10.48445/f0863-4369-9462-o

**F O L K L O R E**

# Scientific analysis of games and the importance of children's mental and physical development

***Chinara Rzayeva***
PhD in Philology, Nakhchivan Branch of ANAS. Azerbaijan.
E-mail: cinarerzayeva@yahoo.com.tr
https://orcid.org/0000-0003-0655-9342

**ABSTRACT**
The main part of children's folklore is games. It is gratifying that children's games are suitable for all ages. Children's games are very important for health and mental development. Some of these games develop the mind, and some increase health, that is, sports. The article explores a number of children's games and explains how important they are for children's health.
It should be noted that the educational value of children's games, the role of which is to increase health, attention, develop various skills, and most importantly to avoid bad habits, is undeniable, and its importance is great.

**KEYWORDS**
children, folklore, games, attention, development

**ARTICLE HISTORY**
Received: 09.08.2021
Accepted: 16.08.2021

## Giriş / Introduction

Uşaqların və gənclərin tərbiyəsində, sağlamlığında bədən tərbiyəsi və idman müstəsna rol oynayır. "Dünya təcrübəsi, əsrlər boyu sübut etmişdir ki, fərdin mənəvi və fiziki sağlamlığı, son nəticədə xalqın ümumi sağlamlığı, millətin bu günü və gələcəyidir".[4]

Uşaq folklorunun qorunub saxlanılması və gələcək nəsillərə olduğu kimi çatdırılmasında valideynlərlə yanaşı, müəllimlərin də rolu böyükdür. Uşaq oyunlarının bəzilərindən idman dərslərində istifadə etmək mümkündür. Əvvəllər məktəblərdə "Bənövşə bəndə düşə, bizdən sizə kim düşə?" çox sevilərək oynanılan oyunlardan biri idi. İndi isə demək olar ki, bu cür oyunlar oynanılmır. Bu da uşaq oyunlarının zaman keçdikcə yox olmasına səbəb olur. Çünki indiki uşaqlar daha çox elektron cihazlarla vaxt keçirərək zehinlərini yorur, gözlərini məhv edir, həm də şüaya məruz qalırlar. Buna görə də uşaqları bu oyunlardan çəkindirmək üçün uşaq folklorunda yer alan oyunlara meyilləndirmək, onlarda bu oyunlara maraq yaratmaq və sevdirmək gərəkdir. Bu məsuliyyət valideyn və müəllimlər arasında bərabər şəkildə bölünməlidir. Yəni bu məsələni birtərəfli həll etmək mümkün deyil. Bu iş eyni zamanda həm evdə, həm də məktəbdə aparılmalıdır. Belə ki, məktəbdə bu işin ən səmərəli həll yolu məhz idman dərsləri vasitəsilə həyata keçirilməsidir.

Zehni inkişaf etdirən oyunların bir neçəsinə nəzər salaq:

*"Son hərfə görə söz demə"*

"Ən az iki oyunçu ilə oynanılan bu oyunda oyunçulardan biri hər hansı bir söz söyləyir. Həmin söz hansı hərflə bitirsə, digər oyunçu həmin hərflə başlayan söz deməlidir. Bu oyunda diqqət edilməsi lazım olan bəzi qaydalar vardır. Onlardan biri də odur ki, oyunçu elə söz seçib deməlidir ki, o sözün son hərfi elə hərf olsun ki, digər oyunçu həmin hərfə uyğun, sonu "ı" hərfi ilə bitən söz söyləyə bilməsin. Məsələn, oyunçulardan biri "heyva" desə, digəri "ayı" deyə cavab verəcək və qalib gələcək. Çünki "ı" hərfi ilə söz başlamır. Oyunun bir başqa qaydası isə oyun içində bir sözü bir neçə dəfə demək olmaz. Bir dəfə "heyva" demisənsə, yenə "h" hərfi ilə başlayan söz demək lazım olsa, onda "heyva" demək olmaz. Bəzən oyunu daha da çətinləşdirmək üçün oyunçular oyunda sadəcə ya "meyvə adı söyləmə", ya da "quş adı söyləmə" kimi qaydalar tətbiq edirlər" [2, s.380]. Onu da əlavə edək ki, bu oyun "Ad oyunu" kimi də tanınır. Oyunda yalnız adam adı, şəhər adı, ölkə adı da deyilə bilər.

[4] http://portal.azertag.az/az/node/15564

Bu oyun uşaqların leksikasını zənginləşdirir, söz ehtiyatlarını artırır və onları bir qədər düşünməyə vadar edir. Oyunu bir dəfə oynayan şəxs növbəti oyunda qalib olsun deyə, müəyyən kitablar mütaliə edir, istər meyvə-tərəvəz, istərsə də adlar və s. ilə bağlı kitab və lüğətlərə nəzər salmalı olur. Bu fakt da oyunun uşaqlara müsbət təsir etdiyini və onun əhəmiyyətini bir daha göstərir.

*“Qəcəmə daş” (Beşdaş)*

*“Qəcəmə daş”, “Beşdaş”* adları ilə tanınan və hər kəs üçün maraqlı olan bu oyun xüsusi bacarıq və diqqət tələb edir. Çünki oyunçu həm atdığı daşa baxmalıdır ki, tuta bilsin, həm də yerdəki daşları qaydasında, digərlərinə dəymədən götürməlidir. Deməli, bu kimi oyunların uşaqların bacarığının ortaya çıxmasında, özünə inamında, diqqətinin artması və paylanmasında böyük əhəmiyyəti vardır. Bu oyunda uşaq həm də çətinlikdən çıxmağın yollarını axtarır. Daş barmaqlarının arasında sıxılaraq onu incitməklə quş tapması və küpədən bal çıxartmaqla barmaqlarının üstünün cırmaqlanması ilə anlayır ki, məqsədinə nail olmaq üçün çətinliklərin öhdəsindən gəlməlidir. Oyunun bir neçə variantı xalq dilindən toplanaraq folklor kitablarına daxil edilmişdir. Ancaq kitablarda oyunun tam versiyası verilmədiyindən, həmin versiyanı tam şəkildə ilk dəfə olaraq məqalədə təqdim edirik:

Oyun iki nəfər arasında keçirilir və oyuna ilk dəfə kimin başlayacağını müəyyən etmək üçün aşağıdakı bəndlərdən biri deyilir:

Em, em, emişqa,
Cibi dolu semişqa.
Mən istədim vermədi,
Adın qoydum hin-duş-qa.

və yaxud:

Ekidi-mekidi bilmərəm,
Fərideni dindirmərəm.
Fəridə yaman forsludur,
Nizaminin dostudur.

Sayılan zaman ən son söz kimə düşərsə, həmin oyunçu oyuna birinci başlayır. O, daşları əlində komalayıb yerə atır. Sonra onlardan hansını istəsə əlinə götürür. Buna səqqə deyirlər. Sonra bu səqqə deyilən daşı göyə ataraq, daşları bir-bir əlinə götürür. Bu zaman gərək səqqə yerə düşməyə, daşlar isə tərpənib bir-birinə dəyməyə. Qeyd edək ki, oyunda ancaq bir əldən istifadə edirlər. İkinci əli işlətmək olmaz. Birinci mərhələ belə başa çatır. Oyun bir neçə mərhələdən ibarət olur. Getdikcə

oyunun şərtləri çətinləşir. Sonra daşları iki-iki, daha sonra üç-bir əlinə götürürsən. Bu mərhələ keçdikdən sonra daşların hamısı göyə atılır, yerə düşən daşlardan birini sağ əlinə alıb, sonra sol əlin iki barmağını – baş və orta barmağı körpü yaradacaq şəkildə yerə qoyursan, digər oyunçu yerdəki daşlardan birini molla olaraq seçir. İştirakçı seçim zamanı daşlara mane törədəcək olanı seçir ki, daşlar ona dəysin və oyunçu uduzsun. Oyunçu səqqəni göyə atıb-tutana qədər yerdəki daşların hamısını bir-bir, sonra iki-iki, sonra birini bir, üçünü bir, axırda da hamısını birdən, molla daş da daxil olmaqla iki barmağının arasından keçirtməlidir. Uduzan şəxs oyunu başdan başlamalıdır. Oyunu başa çatdıran qalib hesab olunur. Qalib olan uduzana cəza verir. İki əlinin ortasına bir daş qoyub əllərini bir-birinə bükülü – bir az yer saxlayacaq şəkildə "küpədən bal çıxart" – deyir. Uduzan daşı götürmək istəyəndə əlini tutaraq götürməyə icazə vermir, ancaq o, bir yolunu tapıb götürməli və yaxud iki barmağının arasına daşı qoyub sıxaraq "quş göstər" – deməlidir.

Hamıya məlumdur ki, **"**Yetişməkdə olan gənc nəslin sağlamlığının təmin edilməsində, intellektual və mədəni səviyyəsinin yüksəldilməsində, onların vətənpərvərlik hisslərinin tərbiyəsində, əməyə, vətənin müdafiəsinə hazır olan mərd, cəsur insanlar kimi yetişməsində idmanın rolu əvəzsizdir".

Folklorda idman xarakterli oyunlar da az deyil. Bu qəbildən olan oyunlardan bir neçəsinin adını xatırlamaq yerinə düşər: *"Cipbolik", "Top çiləmə", "Qovala qaç"* və s.

*"Cipbolik"*

"Bu oyunun oynanılması həm oğlanlar, həm də qızlar üçün nəzərdə tutulub. Oyun iştirakçıları tək ayaq üstündə dayanır, bükülüb yuxarı qaldırılmış ayaqla cipboliki oynadırlar. Kim axıra qədər "yanmadısa", o, qalib olur. Oyunun ikinci hissəsi çiləmə, bəzən də tərləmə adlanır. Udanla uduzan müəyyən məsafədə dayanırlar. Uduzan cipboliki udanın ayağına atır. Udanın ayaqla vurduğu cipbolik hara düşürsə, uduzan gedib onu gətirməlidir" [2, s.416-417]. Bu oyunda bədən əzələləri hərəkət etdiyi üçün sağlamlıq baxımından uşaqlara xüsusilə faydalıdır.

Qeyd edək ki, *"İp atlama", "Bənövşə", "Dəsmal aldı qaç", "Ortayagirmə"* və digər oyunların tərbiyəvi əhəmiyyəti, sağlamlıq, diqqət artırmaq, müxtəlif növ bacarıqları inkişaf etdirmək, ən əsası isə pis vərdişlərdən uzaq olmaq üçün rolu danılmaz, əhəmiyyəti isə böyükdür.

İlk olaraq *"Bənövşə"* oyununun qaydasını xatırlayaq:

"Bu oyunda uşaxlar iki dəstiyə ayrılıllar. Hər dəstədə onnarın sayı eyni olmalıdır. Dəstələr özünə başçı seçir və bir-birinnən on-on beş addım aralı əl-ələ tutub dayanıllar. Başçılardan biri o birisinə deyir: – Bənövşə!

O birisi cavab verir: – Bəndə düşə!

Əvvəlki başçı deyir: – Bizdən sizə kim düşə? O biri başçı uşaxlardan birinin adını çəkir. Məsələn: – Arzu düşə! Arzu cərgədən ayrılıb yüyürə-yüyürə əl-ələ tutmuş uşaxların əlini yarmalıdır. Əgər o, cərgəni yarıb keçə bilsə, həmin dəstədən bir uşax da götürüb yenə əvvəlki yerinə qayıdır. Yox, keçə bilməsə, orada qalıb, rəqib dəstəyə qoşulmalıdır. Axırda hansı dəstədə çox uşax qalsa, o dəstə qalib gəlir” [2, s.358-359].

Bu oyunda uşaqların əl-ələ tutması onların birliyini, bir-birinə dəstəyini göstərir. Uşaqlar qazanmaq, qalibiyyət əldə etmək üçün özünə güvənməyi, möhkəm olmağı öyrənirlər. Həmçinin birlikdə bir çox çətinliklərin öhdəsindən gəlməyin mümkün olduğunu anlayırlar. Burada uşaqlara aşağıdakı atalar sözlərini xatırlatmaq yerinə düşər:

Güc birlikdədir [1, s.119].

Birlik harada, dirilik orada.

Birlik olmayan yerdə dirilik olmaz [1, s.62].

Bədən dilinin öyrənilməsində də bir çox oyunların xüsusi təsiri vardır. Məsələn, onlardan *“Dəsmal aldı qaç”* oyununu nümunə göstərə bilərik. Oyunu xatırlayaq:

“Bu oyunu balaca uşaqlar oynayıllar. Uşaqlar dayirəvi şəkildə düzülüllər. Sonra sanama yolu ilə ayaq üsdündə say sayıllar:

Bir-iki,
Bizimki.
Üç-dörd,
Qapını ört.
Beş-altı,
Daşaltı.
Yeddi-səkkiz,
Firəngiz.
Doqquz-on,
Qırmızı don.
Arabaya qon,
Arabanın təkəri,
Aslan vurdu Şəkəri,
Hop, hop, hop.

Uşaqların hansında bu say qalır, həmin uşağa dəsmal təqdim olunur. Sonra uşaqlar dairəvi şəkildə yerə oturullar. Oyun başlayır. Həmin uşaq dayirə boyunca qaçır. O qaçan müddətdə yerdən bir uşaq belə bir bayatı deyir:

Qızıl gülü dərəllər,
Məxmər üsdə sərəllər.
Xoş o qızın halına,
Sevdiyinə verəllər.

Dəstədəki oyunçulardan başqa birisi daha bir bayatı deyir:

Qarabağda bağ olmaz,
Qara salxım ağ olmaz.
Qonşuda qız sevənin,
Ürəyində yağ olmaz.

Dayirə boyunca qaçan həmin uşaq isə müəyyən müddətdən sonra dəsmalını oyunçulardan birinin arxasında yerə qoyur. Arxasına dəsmal atılan uşaq bunu görsə, qalxıb onu tutmağa çalışır. Əgər tuta bilsə, o, həmin uşağın yerinə oturur, tutulan uşaq isə yenə dayirə boyunca qaçır və dəsmalını oyunçulardan birinin arxasında yerə qoyur. Yox, əgər tuta bilməsə, onda həmin uşaq yenidən dayirə boyunca qaçır və dəsmalını oyunçulardan birinin arxasında yerə qoyur. Dayirə boyunca uşaq qaçdıqca oturan uşaqlar ya bayatı deyir, ya da mahnı oxuyurlar [3, s.177-178].

Bəzi oyunların çoxvariantlı olması hər kəsə məlumdur. Bu oyunun da bir neçə variantı vardır, lakin demək olar ki, onların hamısının məzmunu eynidir. Biz bu variant üzərində təhlil aparırıq. Bu oyunda əsasən uşaqlar çox diqqətli və həssas olmalıdırlar ki, dəsmalı tapa bilsinlər. Yəni onlar qarşısındakıların mimikasından, üz cizgilərindən hiss edir ki, dəsmal kimin arxasındadır. Bu oyunla uşaqlar həm bədən dilini öyrənir, həm də qaçaraq müxtəlif bədən hərəkətləri edirlər. Bundan başqa, oyun zamanı deyilən bayatılar, oxunan mahnılar da uşaqların folklor lüğətini xeyli zənginləşdirir.

Uşaqların sağlamlığı üçün *"Ortayagirmə", "İp atlama"* oyunlarının da rolu böyükdür. Hamımıza tanış olan bu oyunları qısa şəkildə xatırlayaq:

*"Ortayagirmə", "Ortada qaldı"* adları ilə tanınan bu oyunda həm oğlanlar, həm də qızlar iştirak edir. İki qrupa bölünən tərəflərin nümayəndəsi digər tərəfin nümayəndəsini vurmaq üçün bir-bir durub top atır. Ortada olan oyunçu da atılan top ona dəyməsin deyə ortadan qaçmalı, ya da topu tutub əlavə canlar qazanmalıdır.

Bu oyun uşaqların sağlamlığı üçün mühüm əhəmiyyətə malikdir. O, həm uşaqların həmrəy olmasını, həm də onların rəqiblərini yenməsi üçün bacarıqlarını ortaya çıxarır.

*"İp atlama"* oyunu isə sırf idman xarakterlidir.

Uşaqların dünyagörüşünü, söz ehtiyatını artıran, zehnini inkişaf etdirən oyunlardan biri də *"Ad"* oyunudur. *"Şəhər-kənd", "Ad-familya"* və s. adlarla xalq arasında, xüsusən də uşaqlar arasında tanınan bu oyunlar leksikanı zənginləşdirir, şəhər və ölkələrlə bağlı dünyagörüşü artırır. Uşaqlar oyun prosesində həm kəndlərin adını mənimsəyir, həm heyvanlar aləmi ilə bağlı geniş məlumata sahib olur, meyvə-

tərəvəzlərlə bağlı lüğətləri zənginləşir, həm filmlərlə, həm də əşyalarla bağlı dünyagörüş və bilikləri artır. Sadalananlarla yanaşı bu oyunlar onlarda çeviklik vərdişlərini də artırır. Çünki onlar qoyulan zaman ərzində və yaxud ilk olaraq sözləri taparaq oyunu dayandırmalıdırlar. Vaxtdan düzgün istifadə etmək, sürətli olmaq oyunçunun qalibiyyəti deməkdir. Yalnız tək bu oyuna əsaslanaraq deyə bilərik ki, uşaqların hərtərəfli formalaşması və müxtəlif sahələr üzrə inkişaf etməsində uşaq oyunlarının rolu əvəzedilməzdir. Xalq arasında, xüsusən də uşaqlar arasında tanınan bu oyunun məzmunu aşağıdakı kimidir:

Oyunda iki və daha çox oyunçu (oğlan və qızlar) iştirak edə bilər. Hərə bir ağ vərəq götürərək, onu doqquz və ya daha çox sütuna bölür. Uşaqlarda bu oyun haqqında əyani təsəvvür yaratmaq üçün onu qısa olaraq cədvəl formasında aşağıdakı kimi təqdim edirik:

| № | Ad-soyad | Şəhər-ölkə | Kənd | Heyvan və həşərat | Meyvə-tərəvəz | Kino | Əşya | Xal |
|---|---|---|---|---|---|---|---|---|
| 1. | Bilal 10 | Bakı 10 | Bulqa 10 | balıq 10 | banan 10 | Babək 10 | balta 10 | 70 |
| 2. | Arzu 10 | Adana 10 | Aralıq 10 | arı 10 | armud 5 | Ad günü 10 | açar 10 | 65 |
| | | | | | | | | 135 |

Hər sütunun yuxarı hissəsində cədvəldə göründüyü kimi ad-soyad, şəhər-ölkə, kənd, heyvan və həşərat, meyvə-tərəvəz, kino, əşya və xal sözü yazılır. Oyuna hansı hərflə başlamaq üçün ilk hərfi deyən oyunçunu seçmək lazım gəlir. Bunun üçün aşağıdakı sanama deyilir:

Ekidi-mekidi bilmərəm,
Fərideni dindirmərəm.
Fəridə yaman forsdudur,
Nizaminin dostudur.

Və yaxud da “çela” qoyulur. Qazanan uşaq ilk hərfi ya deyir, ya da qələmi yazının üstündə fırlayır, uşaqlar “stop” deyəndə dayanır. Qələm hansı hərfin üstünə düşsə, onunla da başlayırlar. Sonrakı mərhələlərdə isə oyunun qalibi hərfi müəyyən edir. Bu oyunda bəzən vaxt qoyulur, bəzən də ən tez yazıb qurtaran “stop” deyərək, oyunu dayandırır. Sonra isə bir-bir yoxlayırlar. Düz olanlara xal yazılır. Əgər o addan başqası da yazıbsa, o zaman xallar iki iştirakçı arasında bərabər bölünür. Yuxarıdakı

cədvəldə də xalları yarı bölərək göstərmişik. Hər oyunun sonunda xal sütununa xalların cəmi yazılır. Beləliklə, oyun sonadək davam etdirilir. Neçə oyun oynanılacaqsa, əvvəlcədən müəyyən edilir. Əgər oyun 10 və ya 15 turdan ibarətdirsə, turlar bitəndən sonra ümumi xallar cəmlənir. Xalı çox olan oyunçu qalib seçilir.

**Nəticə / Conclusion**

Məqalədə əsasən, oyunların uşağın milli ruhda böyüməsinə, hərtərəfli inkişafına, yaradıcılıq qabiliyyətinin formalaşmasına göstərdiyi müsbət təsirlər araşdırıldı, uşaq oyunlarının onların həyatındakı yeri müəyyən edildi, oyunların uşaqların fiziki tərbiyəsindəki əhəmiyyəti, onların sağlamlığına təsiri və tərbiyəvi əhəmiyyəti nümunələr əsasında izah olundu.

Aparılan təhlillər göstərir ki, uşaq folklorunda yer alan bu oyunlar uşaqları pis vərdişlərdən, uşaq sağlamlığı üçün ziyan olan kompüter, mobil telefon və digər şüa ötürən elektron vasitələrdən uzaqlaşdırmaq üçün mühüm rol oynayır. Təəssüf hissi ilə qeyd etməliyik ki, insan üçün hərtərəfli yararlı olan bu oyunlar günümüzdə çox az oynanılır. Bu da uşaqların tərbiyəsində böyük fəsadların yaranmasına gətirib çıxarır. Çünki sağlamlıq, zehni və fiziki inkişaf üçün önəmli olan bu oyunlar uşaqlara ziyan vuran, onların sağlamlığını əlindən alan oyunlarla əvəz olunub. Hamılıqla çalışmalıyıq ki, bu oyunlar unudulmasın, əksinə, uşaqlar arasında daha çox oynanılan oyunlar sırasına daxil edilsin.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Bəydili C. (2004). Atalar sözü. Bakı, Öndər. 264 s.
2. Naxçıvan uşaq folklorundan örnəklər. (2017). Bakı, AR Prezidenti yanında Elmin İnkişaf Fondu.
3. Gözəlov F., İmanov M., Rüstəmzadə İ., Orucov T., Abbasov E. (2017). Qarabağ xalq oyunları və meydan tamaşaları. Bakı, AR Prezidenti yanında Elmin İnkişafı Fondu. 280 s.
4. http://portal.azertag.az/az/node/15564